# SÜNNƏT VƏ TƏBABƏT

PEYĞƏMBƏR HƏDİSLƏRİNDƏKİ TƏBABƏTƏ DOĞRU MÜNASİBƏT NECƏ OLMALIDIR?

Bu zamanımızda müşahidə etdiyimiz hallardan birini müzakirə etməyə ehtiyac görürəm. Təcrübəmiz bəzi təsəvvürlərin dəyişməsinə ehtiyac olduğunu tələb edir. Üzərində durmaq istədiyim məsələ tibb və peyğəmbərin hədisləri ilə bağlıdır.

Cəmiyyətimizdə namaz əhlinin arasında "peyğəmbər tibbi" xüsusi sevgi və bağlılıq ilə qarşılanır. Bunun özlüyündə heç bir problem yoxdur, çünki peyğəmbərə olan sevgidən ortaya çıxan bir nəticədir. Lakin biz bu barədə kifayət qədər maarifləndirmə aparmışıqmı? Çünki tibb sahəsi əhəmiyyətsiz bir sahə deyildir, insanların sağlamlığı ilə, həyatları ilə *bir başa tə*masda olan bir işdir. Bu baxımdan tibb barəsində danışmağımız lazımdır. Peyğəmbər tibbi barəsində aşırı fikirlərə sahib olmaq doğru olmadığını izah etməyimiz lazımdır. Başa *düşmə*liyik ki, tibb sahəsində h*ər şeyd*ən əvvəl tibbi təcrübələrdən çıxmış nəticələrə etibar etmək lazımdır.

Peyğəmbər tibbi hətta bu günlərdə ticarət vasitəsinə çevrilib. Qara zirə və bu kimi peyğəmbər tibbində adı keçən təbi ədəvanın əhəmiyyətini kiçiltmək istəmirik, lakin bunun mütləq tibb ekspertləri tərəfindən kontrolda saxlanılmasının zərurətinə toxunmalıyıq. Bəli, bizdə onsuz da səhiyyə sahəsi ağır vəsiyyətdədir, ölkəyə gətirilən dərmanların keyfiyyəti haqqında nə qədər ağlasaq da azdır. Bizi narahat edən təkcə səriştəsizlər tərəfindən nəbəvi tibbin sui-istifadə edilməsi deyildir. Bizi narahat edən əsas səbəb bunun doqmaya çevrilərək təbliğ edilməsidir. Bunun nəticəsində müasir tibb elmi ilə uyğunsuzluqlar dinin əleyhində bir alətə çevrilir, halbuki dinin təlim obyekti tibb deyildir. Bir müsəlman nəbəvi tibbdəki bəzi ünsürlərin möcüzə olduğuna bir müddət inandıqdan sonra müasir tibbi k*əşfl*ərdən oxuduğu nəticələr onun imanını sarsıdır. Etiraf edək ki, bu gün xeyli müsəlmanın imanı bu cür səthi qavramlar üzərində qurulub. Onu da qəbul edək ki, bu müqəddəs dini hər pusqudan vurmağa çalışan maraq dairələri var.

Bütün bunları nəzərə alaraq açdığımız bu müzakirədə müsəlmanlara nəbəvi tibbə dair islam alimlərinin baxışlarını təqdim edəcəyik. İlahiyyatçılarımızın bu mövzulardan xəbərləri olmalıdır və ictimaiyyət qarşısına çıxdıqda dinin mahiyyətini insanlara doğru çatdırmalıdırlar. İlahi, uxrəvi təlimlər ilə bəşəri, dünyəvi təlimləri ayırmaq lazımdır. Ümid edirik ki, bu araşdırmamız ilahiyyatçılarımızın beynində bəzi təsəvvürlərin dəyişməsinə səbəb olacaq. Müvəffəqiyyət Allahdandır.

**BİRİNCİ MÜQƏDDİMƏ**: Mövzuya hər *şeyd*ən əvvəl önəmli bir müqəddimə ilə *başlamaq ist*əyirəm. Bununla peyğəmbərimizin – aleyhissələm – sözlərinin hansı məqamda dəlil və hüccət olduğunu, hansı məqamda isə belə olmadığını göstərməyə çalışacam. Bu mövzu üsul kitablarında təfsilatı ilə müzakirə olunmuş mövzulardandır, müasirliyin tələbindən ortaya çıxmış bir ixtira deyildir. Bu müzakirələrin xülasəsi budur ki, peyğəmbərimiz – salləllahu aleyhi va səlləm – dini məsələlərdə, Allahdan təbliğatda məsumdur, yəni xəta etməz. Düny*əvi işlə*rə gəldikdə isə burada xəta etməsi mümkündür və onun düny*əvi işlə*rdə dediyi sözlər sadəcə mübah qisminə daxildir və hüccət deyildir. Bunu isbat edən bəzi hədislər varid olub. Ummu Sələmə peyğəmbərin belə dediyini rəvayət edir: "**Mən sadəcə bir bəşərəm; mənə münaqişə edən tərəflər gəlir, ola bilsin ki, sizdən kimsə o birindən daha tutarlı danışır və onun doğru danışdığını güman edirəm. Buna görə də onun xeyrinə hökm verirəm. Hər kimə bir müsəlmanın haqqından kəsib vermişəmsə bilsin ki, o sadəcə cəhənnəmdən bir parçadır; istəsə götürsün, istərsə tərk etsin!**"[1] Bu hədisdən anlaya bilirik ki, peyğəmbərimiz zalım birinin məzlum olduğunu, məzlumun isə zalım olduğunu güman edə bilə*r. Bu kimi işlə*rdə xəta etməsi onun bəşər övladı olmasına görədir. Rafi bin Xudeyc rəvayət edir ki, "**peyğəmbər – salləllahu aleyhi va səlləm – Mədinə şəhərinə gəldi və onlar xurma ağaclarını tozlandırırdılar... Dedi: "Nə edirsiz?" Dedilər: "Biz belə etmişik." Dedi: "Ola bilsin ki, belə etməsəniz daha yaxşıdır." Buna görə də bunu etməyi tərk etdilər, buna görə də məhsul qüsurlu oldu. Bunun xəbərini ona verdiklərində dedi: "Mən sadəcə bir bəşərəm; sizə dininizdən bir şeyi əmr etsəm götürün, amma öz rəyimdən bir şeyi sizə əmr etdiyimdə mən sadəcə bir bəşərəm.**"[2] Eyni hadis*əni Aişə* və *Ənə*s bin Malik də rəvayət edir və onların xəbərlərində peyğəmbərimiz səhabələrinə "**siz dünya işlərinizi daha yaxşı bilirsiz**"[3] deyir. Həmçinin müharibə *işlə*rində dəfələrlə səhabələrinin rəyi ilə öz rəyini də*yişmə*si də eyni mənaya dəlal*ət edir. Bütün bu aşkar d*əlillərə əsasən alimlərimiz peyğəmbərin – aleyhissalətu vassələm – düny*əvi işlə*rdə xəta edə biləcəyini

---

[1] "Sahih əl-Buxari", (2458)
[2] "Sahih Muslim", (2362)
[3] "Sahih Muslim", (2363)

təsdiqləyiblər. Rağib əl-İsfəhani (vəfatı hicri 502) deyir: "**Peyğəmbərin işləri ya dini, ya da dünyəvi ola bilər... Geodeziya, yazı və riyaziyyat kimi dünyəvi elmlərə gəldikdə məlumdur ki, peyğəmbər bu işlərin çoxunda başqalarının köməyindən istifadə edirdi, hətta özü şəxsən bu işlərdə qüsurlu olduğunu aydın şəkildə ifadə edib... Beləliklə də bilmiş oluruq ki, dünyəvi mövzularda peyğəmbərin – aleyhissələm – halı ilə başqalarının halı eynidir.**"[4] İbn Həzm (h. 384-456) deyir: "**Bu, dünya işi ilə din işi arasında fərqin olduğunu göstərən, isnadı səhih olan açıq-aşkar bəyandır. (Həmçinin onu göstərir ki,) o – salləllahu aleyhi va səlləm – din haqqında yalnız Allahdan öyrəndiklərini deyir və başqa mövzularda öz rəyi ilə dediklərində onun üçün başqa rəyə də işarə edilməsi, beləliklə də onun – aleyhissələm – o rəyi götürməsi mümkündür. Çünki bunların hamısı onun üçün mübah, sərbəst işlərdir və biz, azı istisna olmaqla heç bir xeyri olmayan dünya işlərində ondan daha bəsirətliyik. O isə Allahın istədiyini və bizi həqiqi xeyirlərə götürən dini işləri bizdən daha yaxşı bilir.**"[5] Allah – təbərakə va təalə - deyir: "**İsa aydın dəlillərlə gəldiyi zaman dedi: "Mən sizə hikmət gətirmişəm və haqqında ziddiyyətə düşdüyünüz bəzi şeyləri izah etmək üçün (gəlmişəm). Allahdan qorxun və mənə itaət edin!**" (43:63) Bu ayədə İsanın bütün şeyləri yox, b*əzi şeylə*ri izah etmək üçün gəldiyi ifadə olunur. Qazi əl-Beydavi (hicri 685) deyir: "**İsa möcüzələr yolu ilə aşkar dəlillərlə və ya İncilin ayələri ilə və ya aşkar şəriət hökmləri ilə gəldikdə dedi: "Sizə İncil və ya şəriət yolu ilə hikmət gətirdim və (gəldim) ki, sizin fikir ayrılığına düşdüyünüz bəzi məsələləri sizə izah edim." Bu, din işləri ilə bağlı olan məsələlərdir, dünya işi ilə bağlı deyildir. Çünki peyğəmbərlər dünya işlərini izah etməkdən ötrü göndərilməyiblər. Ona görə də (Muhəmməd peyğəmbər) – aleyhissələm – dedi: "Siz dünya işlərinizi məndən daha yaxşı bilirsiz.**"[6] Bu məlumatlar bizə əhəmiyyətli bir fərqi öyr*ətmiş oldu və* bu fərqi hər zaman nəzərdə saxlamaq lazımdır.

---

[4] "Təfsirur-Rağibil-Əsfəhani", 3/952-955; Tanta Universiteti, Tanta, 1999
[5] "əl-İhkəm fi Usulil-Əhkəm", 5/138-139;
[6] Beydavi, "Ənvarut-Tənzil va Əsrarut-Təvil", 5/95; Dar İhyəit-Turasil-Arabi, Beyrut, 1997

**İKİNCİ MÜQƏDDİMƏ**: Peyğəmbərimiz – aleyhissalətu vassələm – təbib olubmu? Ümumiyyətlə belə bir iddia edibmi? Bu sualın cavabını öyrənmək üçün hədislərə nəzər salmağımız lazımdır. *Əbu Hureyra* rəvayət edir: "**Peyğəmbərin – salləllahu aleyhi va səlləm – səhabələrindən biri (Uhud günü) böyründən yaralandı, o qədər qan qusmağa başladı ki, onun öləcəyi qorxusu var idi. Allahın elçisi – salləllahu aleyhi va səlləm – müalicə edən iki nəfəri gətizdirdi və onlardan soruşdu: "Cahiliyyə zamanı bu tibb elmindən nə ilə müalicə edirdiniz?" Dedilər: "Allah bizə islam dinini göndərənə qədər cahilliyədə bunu müalicə edərdik, sonra bunu tərk etdik və yalnız təvəkkül edirik." (Peyğəmbər) dedi: "Onu müalicə edin!" Onlar dedilər: "Ey Allahın elçisi, məgər tibb elmində xeyir varmı?" Dedi: "Bəli, xəstəliyi göndərən onun dərmanını da göndərib. İstədiyi şeyin şəfasını istədiyi şeydə yaradıb.**"[7] İmam Malikin "əl-Muvatta" və İbn *Əbi Şey*bə'nin "əl-Musannəf" kitabında rəvayət etdiklərinə əsasən "**Allahın elçisinin – salləllahu aleyhi va səlləm – zamanında bir nəfər yaralanmışdı və yaradan qan kəsilmirdi. Allahın elçisi – salləllahu aleyhi va səlləm – bənu-ənmər tayfasından iki nəfəri gətizdirdi və soruşdu: "Tibbi hansınız güclü bilir?" Bir nəfər soruşdu: "Ey Allahın elçisi, məgər tibbdə xeyir varmı?" Dedi: "Şübhəsiz ki, xəstəliyi göndərən onun dərmanını da göndərib.**"[8] *Əg*ər Allahın elçisi – aleyhissələm – təbib olsaydı onlardan hansının tibb elmində daha güclü olduğunu soruşmazdı. O dövrün tibbindəki bəsitliyi, sadəliyi nəzərə alarsaq rahatlıqla deyə bilərik ki, tibb haqqında peyğəmbərimiz vəhy alsaydı onu səhabələri üzərində özü tətbiq edərdi və onları müalicə etm*ək üçün başqa* həkimlərə, təbiblərə ehtiyac olmazdı.

Əbu Davud "əs-Sünən" kitabında Sad bin *Əbi* Vaqqas'dan belə dediyini rəvayət edir: "**Xəstələndim və Allahın elçisi – salləllahu aleyhi va səlləm – mənim ziyarətimə gəldi. Əlini sinəmin üstünə qoydu, hətta sərinliyini ürəyimdə hiss etdim. Sonra dedi: "Sən ürəyi xəstə adamsan, Saqif qəbiləsindən əl-Haris**

---

[7] Əbu Nueym, "ət-Tibb ən-Nəbəvi", (32)

[8] İbn Əbi Şeybə, "əl-Musannəf", 5/31; Əbu Musab əz-Zuhri, "əl-Muvatta", (1983);

**bin Kəldə'nin yanına get, çünki o, tibb ilə məşğul olan bir adamdır...**"[9] əl-Haris bin Kəldə qeyri müsəlman idi, amma tibb ilə məşğul olan biri idi. Peyğəmbərimiz – aleyhissalətu vassələm – sevimli səhabəsi, anasının əmisi oğlu Sad bin *Əbi Vaqqas*ı qeyri müsəlman həkimə təslim etməsinin bir hikməti olmalı idi. *Əgə*r özü təbib olsaydı bu işi qeyri-müsəlman həkimə tapşırmazdı. Peyğəmbərimizdən "**hər peşədə o işin əhlindən kömək alın!**" ləfzi ilə bir hədis rəvayət olunur. Bu hədisi alimlərimiz münkər hədislərdən hesab edirlər. Bu hədisin səhih olmadığını bəyan etdikd*ən sonra Şeyx Abdurrahmə*n bin *Əli əş-Şeyb*əni deyir: "**Bu mənaya şahidlik edən Əbu Davud'un sünən kitabında Sad (bin Əbi Vaqqas)dan sabit olan hədisdir ki, orada deyir: "Bir xəstəliklə xəstələndim və Allahın elçisi – salləllahu aleyhi va səlləm – məni ziyarət etmək üçün gəldi; əlini sinəmin ortasına qoydu, hətta əlinin sərinliyini ürəyimdə hiss etdim. Mənə dedi: "Sənin ürəyin ağrıyır, ona görə də Saqif'dən olan əl-Haris bin Kəldə'nin yanına get! Çünki o, tibb ilə məşğul olan adamdır.**"[10] Beləliklə də İmam əs-Səxavi'nin tələbəsi Abdurrahmən *əş-Şeyb*əni'yə görə bu hədisdə *baş ver*ən hadisə *"işi* öz əhlinə tapşırmaq" qəbilindəndir.

Xüsusilə maraqlı bir xəbəri bizə *Hi*şəm bin Urva rəvayət edir: "**Urva Aişəyə dedi: "Ey anacan, sənin fiqhi biliklərinə təəccüblənmirəm, çünki Allahın elçisinin – salləllahu aleyhi va səlləm – zövcəsi və Əbu Bəkr'in qızıdır deyirəm. Sənin şer və tarix barəsindəki biliklərinə də təəccüblənmirəm, çünki Əbu Bəkrin qızıdır deyirəm və o, insanların (bu barədə) ən çox biləni idi. Lakin sənin tibb barəsindəki biliklərinə təəccüb edirəm; bu necə olan şeydir? Hardandır bu biliklər?" (Aişə) mənim çiynimə vuraraq dedi: "Ey balaca Urva, Allahın elçisi – salləllahu aleyhi va səlləm – ömrünün sonunda çox xəstələnirdi və hər tərəfdən onun yanına nümayəndəlik gəlirdi. Ona dərmanlar izah edirdilər və mən o dərmanları hazırlayıb müalicə edirdim. Bax ordan bilirəm.**"[11] Burada həm Urvanın sualı, həm də *Ai*şənin cavabı mövzumuzun tam sülbünə toxunur. Çünki əgər peyğəmbərimiz – aleyhissalətu vassələm – təbib olsaydı və ya tibbi ilə tanınsaydı o zaman Urva üçün Aişənin tibbi biliklərinə təəccüb etməsinə səbəb qalmazdı; fiqhi peyğəmbərdən öyrəndiyi kimi tibbi də ondan öyrəndiyini təxmin edə bil*ərdi. Ai*şə anamız da cavabında tibbi peyğəmbərdən öyrəndiyini demir, lakin

[9] "Sunən Əbi Davud", (3875);
[10] "Təmyizut-Tayyibi minəl-Xabis", səh: 21-22; Darul-Kitəbil-Arabi, Beyrut, 1985
[11] "Müsnəd Əhməd", 40/441; "Hilyətul-Əvliya", 2/50;

peyğəmbəri ziyarət etməyə g*əlmiş* ərəb nümayəndəliklərindən öyrəndiyini qeyd edir. Bütün bunlar bizə bir daha göstərir ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – tibbi ilə tanınmayıb və səhabələri arasında belə *bir şeyi iddia etmə*yiblər.

**RƏYLƏR**: Artıq burada nəbəvi tibb ilə bağlı islamın tarixi mirası ilə tanışlıq məqamıdır. Bu gün müsəlmanların arasında bu mövzuda yayılmış bir mənalı təsəvvür tarixin əksidirmi? Yoxsa müsəlman alimlər bu mövzuya bir az daha açıq düşüncə ilə yanaşıblar?

Hər *şeyd*ən əvvəl nəzərə almağımız lazımdır ki, tibb haqqında təsəvvür orta əsrlərdə tamamilə fərqli idi. Onlar müasir zamanımızın imkanlarından məhrum olduqları üçün bəzi həqiqətləri görə bilmirdilər. Texnikanın inkişafı ilə tibbin incəliklərini öyrənmək mümkün olub. Lakin hər bir halda tibb haqqında ümumi və doğru bir təsəvvür var idi. Tibb elminin təbiət elmlərindən olduğunu, bədənin sağlamlığının təbii səbəblər ilə *baş* verdiyini gözəl anlayırdılar. Peyğəmbərimizin – aleyhissalətu vassələm - tibb ilə bağlı sözlərinə gəldikdə isə o dövrün təcrübəsi işığında f*ərqli yanaşmalar görə* bilərik. Burada maraqlı olan budur ki, erkən bir dövrdən birdə*n çox alternativ düşüncə* tərzi mövcud olub.

**Birinci rəy**: Bu rəylərdən birinə görə peyğəmbərin tibb ilə bağlı sözləri adətlər çərçivəsindən kənara çıxmır. Bunu başqa dildə des*ək "mübah işlə*r" çərçivəsinə daxil edirlər. Bu rəydə olan alimlərə görə peyğəmbərin tibb ilə bağlı hədislərində əsli qayda, yeni təməl prinsip onların vəhy mə*n*şəli olması yox, bəşər rəyi olmasıdır. Yalnız daxili və ya xarici dəlillər əsasında hansısa tibbi iddianın vəhydən qaynaqlandığını deyə bilərik. Buradan çıxan nəticə budur ki, peyğəmbərimiz – aleyhissələm – öz dövründə *hasil olmuş biliklə*rə əsasən tibb haqqında xətalı bir rəy bildirə bilər, çünki o da bəşərdir və digər bəşər övladları kimi bu barədə doğru olmayan bir rəyə sahib ola bilər. Bu rəyi təmsil edən alimlərdən *Əbu Süleyman* əl-Xattabi – rahmətullahi aleyhi – hicri 388-ci ildə, miladi 998-ci ildə vəfat edib. *Şafi'i ülə*masının böyüklərindən olan bu alim "*Əa*l*ə*mul-Hədis" kitabında deyir: "**Tibb haqqında ayrılıqda qaldırdığımız müzakirədə, peyğəmbərin – salləllahu aleyhi va sələm – hədislərində tədavi, müalicə ilə bağlı keçən vəsflərin bəyanında dedik ki, tibb iki növdür: Nəzəri tibb və bu, yunanların tibbidir ki, insanlar onu Yer üzü ölkələrinin ən böyük meqapolislərində istifadə edirlər. Ərəblərin və hindlilərin tibbi isə təcrübə tibbidir. Bu barədə orada kifayət qədər izahat verdik. Əgər peyğəmbərin – salləllahu aleyhi va sələm – dərman olaraq vəsf etdiklərinin əksəriyyəti üzərində düşünsən (görəcəksən ki,) onlar ərəblərin metoduna əsaslanır. Qaynağı vəhy olan nəbəvi elm ilə xas olanlar isə istisnadır, beləki bu, təbiblərin dərk etdiklərindən, ağıl sahiblərinin bildiklərindən ötə bir elmdir. Bu şəfaların bir hissəsi təbərrük vasitəsi ilə, onun duası ilə baş verir. Allah onu doğrudan başqa bir şey deməkdən, haqdan başqa bir şey etməkdən qoruduğu üçün bu növdən dediklərinin, etdiklərinin hamısı doğrudur və**

**gözəldir.**”[12] Bu sözlərindən bir qədər sonra deyir: “**Peyğəmbərin – salləllahu aleyhi va səlləm – müəyyən olaraq bir şəxsə yazdığı dərman onun duası, bərəkətləndirməsi və gözəl təsiri ilə ola bilər və bu, bütün fərdlər üçün keçərli olan ümumi hökm olmayacaq. Nəzəri tibb ilə uyğun gəlməyən hər bir şeyi bu məzmunda başa düşmək və bu mənada izah etmək vacibdir.**”[13] Beləliklə də bu alimin sözlərindən başa düşmüş oluruq ki, peyğəmbərin tibb ilə bağlı hədislərinin əksəriyyəti yerli tədavi biliklərinə əsaslanır, lakin bir hissəsi vəhydən qaynaqlanır. Ərəblərdə və hindlilərdə təcrübə tibbi olaraq adlandırdığı bizim dilimizdə “xalq təbabəti” kimi tanınır. Bu növ tədavidən istifadə edərək peyğəmbərimizin – aleyhissələm – sağaltdığı şəxslər olub və əl-Xattabi’yə görə bu hallar onun duası və bərəkəti ilə *baş verə* bilər, ona görə də ümumi hökm kimi qəbul edilməməlidir. Hənəfi *alimi* Ş*əmsul-Əimmə* əs-Səraxsi’nin də (vəfatı hicri 490/miladi 1096) sözlərində buna dəlalət edəcək məqam vardır. “**Sonra deyirik ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – onları bu tədavi ilə xüsusiləşdirib, çünki vəhy yolu ilə onların şəfasının bu tədavidə olduğunu bilib. Belə bir şey bizim zamanımızda mümkün deyildir.**”[14] Biz əs-Səraxsi’nin bunu ümumən bütün tibbə aid etdiyini, yoxsa xüsusən qeyri-adi hallara aid etdiyini bilmirik. Əgər bütün tibbə aid etdək deyə bilərik ki, peyğəmbərin – aleyhissalətu vassələm – qeyd etdiyi tədavi metodları ümumi hökm kimi qəbul edilməməlidir, çünki əs-Səraxsi’nin qeyd etdiyi ehtimala görə bu yalnız peyğəmbərə xas ola bilər. Bu mənanı biz *Əbu Abdill*əh əl-Məziri’nin (vəfatı hicri 536/miladi 1141) sözlərindən də *başa düşə* bilirik. O, qara zirə toxumunun h*ər şeyə* dərman olması barəsində danışarkən deyir: “**Qara zirə toxumu haqqında vəsf etdiyinə gəldikdə isə, qust haqqında dediyimiz kimi bunu da sərin xəstəliklərə aid etmək lazımdır. Peyğəmbər – salləllahu aleyhi va səlləm – insanlara xitab etdiyi zamanda səhabələrinin əksəriyyətinin halından gördüklərinə əsaslanaraq (bir dərmanı) vəsf edə bilər.**”[15] əl-Məziri kitabında başqa yerdə hədislərdən birini tibb ilə uyğun gəlməməsi baxımından analiz edir və həmin hədisdəki tədavini əl-Xattabi’nin izah etdiyi kimi peyğəmbərin duası və bərəkəti ilə əlaqələndirir. Bu nöqtədə əl-Məziri’nin tamamilə əl-Xattabi ilə razılaşdığını deyə bilərik. İmam Şəmsuddin əz-Zəhəbi (hicri 748/miladi 1348) “Təlxis əl-Mustədrak” kitabında deyir: “**Bir dəlil bunun ümumi olduğuna dəlalət etmədiyi müddətdə bütün bunlar onların təbiətlərinə və torpaqlarına xasdır, çünki peyğəmbərin təbabəti onun şəriət buyuruqlarından fərqli olaraq (yalnız) mübah qismindəndir.**”[16] Bu sözlərin eynisini Muhəmməd bin Abdirrahmən əl-Alqami əl-Qahiri (vəfatı hicri 969/miladi 1561) “əl-Cami əs-Sağir” kitabına yazdığı şərhində deyir: “**Peyğəmbərin – salləllahu aleyhi va səlləm - öz səhabələrinə**

---

[12] “Əaləmul-Hədis fi Şərh Sahih əl-Buxari”, 3/2107-2108; Ummul-Qura Universiteti, Məkkə, 1988;
[13] 3/2111
[14] “əl-Məbsut”, 1/54;
[15] “əl-Mulim bi Fəvaid Muslim”, 3/172; Beytul-Hikmə, Tunis, 1991
[16] əz-Zərkəşi, “əl-Bəhr əl-Muhit fi Usulil-Fiqh”, 4/261;

**və o torpağın əhalisinə tətbiq etdiyi təbabəti onların təbiətlərinə və torpaqlarına xasdır, yalnız bir dəlilin bunun ümumi olmasına dəlalət etməsi halı istisnadır.**”[17] Həm əz-Zəhəbi, həm də əl-Alqami təsdiqləyir ki, əsli prinsip peyğəmbərin – salləllahu aleyhi va səlləm – hədislərindəki təbabətin məhdud zamana və məkana xas olmasıdır. Bu xaşlıq peyğəmbərin duası və bərəkəti ilə bağlı ola bilər. Yenə bu alimlərə görə hədisdə keçən hansısa tədavi növü bütün insanlar üçün ümumi ola bilər və bunu biz dəlilin özündən anlaya bilərik.

Bu rəyi ən açıq şəkildə ifadə edən isə böyük alim Abdurrahmən ibn Xaldun (hicri 808/miladi 1406) sayılır. O, *məşhur tarix müqə*ddiməsində deyir: “**Səhra mədəniyyətinə aid tibb var ki, onu əksər hallarda bəzi şəxslər üzərində icra edilmiş qüsurlu təcrübə üzərində qurublar və bunu kəndin qoca kişiləri və qadınlarından öyrəniblər. Ola bilsin ki, ondan bəzi şeylər doğrudur, lakin təbiət qanunu üzərində qurulmayıb və (insandakı) ünsürlərin tərkibinə müvafiq deyildir. Əgərlərdə bu tibb çox yayğın idi və onlarda əl-Haris bin Kəldə və başqaları kimi təbiblər var idi. Hədislərdə nəql olunmuş tibb də bu növdəndir və vəhy ilə heç bir əlaqəsi yoxdur, sadəcə olaraq ərəblərdə olan adətdən qaynaqlanır və peyğəmbərin – salləllahu aleyhi va səlləm – adət və fitrət olan hallar olaraq – məşru olması qəsd olunmadan - zikr olunan əhvalında (bu növ tibb) varid olub. Beləki o – salləllahu aleyhi va səlləm – bizə şəriəti öyrətmək üçün göndərilib, tibb elmini və digər təcrübi elmləri öyrətməkdən ötrü göndərilməyib. Xurma ağaclarını tozlandırmaqla bağlı onun başına gələn hadisədə deyib: “Siz dünya işlərinizi daha yaxşı bilirsiz.” Səhih yolla nəql olunmuş hədislərdə sözü keçən tibb ilə bağlı hər hansı bir şeyi məşru olması mənasında başa düşməmək lazımdır. Buna dəlalət edəcək heç bir şey yoxdur.**”[18] *Şah V*əliyyullah əd-Dihləvi əl-Hənəfi də (hicri 1176/miladi 1762) bu fikri müdafiə edir və deyir: “**Bil ki, peyğəmbərdən – salləllahu aleyhi va səlləm – rəvayət edilmiş və hədis kitablarında yazılmışlar iki qismə ayrılır: Birincisi risalənin təbliği ilə əlaqəli olan... İkincisi isə risalənin təbliği ilə əlaqəli olmayandır; bu növ barəsində peyğəmbərimiz – salləllahu aleyhi va səlləm – bu sözlərini deyib: “Mən sadəcə bir bəşərəm, əgər sizə dininizlə bağlı bir şeyi əmr etsəm götürün, öz rəyimlə bir şeyi əmr etsəm sadəcə bir bəşərəm.” ... Tibb də bu qisimdəndir.**”[19] Bütün bu alimlərin sözündən anlaşılır ki, hədislərdə keçən təbabət ümumi olaraq vəhydən qaynaqlanmır, lakin bəşər təcrübəsinin nəticəsidir, hətta bəzi alimlər bunun ərəblərdəki xalq təbabətindən qaynaqlandığını deyirlər. Üsulçu alimlərimizdən *Əbu* İshaq *əş-Şatibi də* bunu təsdiqləyir. Ərəblərdə mövcud olan elmlərdən danışır, onlardan şəriətin təsdiqlədiyi və ya ibtal ediyi növlərə toxunur. Tibb

---

[17] əl-Azizi, “əs-Sirac əl-Munir Şərh əl-Cami əs-Sağir”, 3/242;

[18] “Tərix İbn Xaldun”, 1/651; Darul-Fikr, Beyrut, 2001;

[19] “Huccətullahi əl-Bəliğa”, 1/224; Darul-Cil, Beyrut, 2005;

elminə gəldikdə deyir: "**Bu elmlərdən biri də tibb elmidir; ərəblərdə bu elmdən bir şey var idi, amma əvvəlkilərdəkinə uyğun deyildi. Oxumaq, yazmaq bilməyən adi insanların təcrübələrindən götürülüb, qədim alimlərin təsdiqlədikləri təbiət elmləri üzərində qurulmayıb. Şəriətdə də bu üslub ilə gəlib, lakin toparlayıcı və şəfa verici tərzdədir, az sözlə çox faydanı əhatə edir. Allahu təalə deyir: "Yeyin, için və israf etməyin!" Hədislərdə də bəzi xəstəliklər barəsində dərmanlar gəlib, onlardan batil olanları ibtal edib. Misal üçün şərab ilə tədavi etməyi, şəriətdə caiz olmayan metodlarla ruqyə etməyi ibtal edib.**"[20] Lakin görünür ki, əş-*Şatibi* şəriətdə gələn tədavi metodlarının qaynaq olaraq xalq təbabətindən gəldiyini təsdiqləsə də Quran və sünnətdə onların içindən faydalı olanlar seçilmiş, batil olanlar r*ədd edilmişdir. əş-Şatibi bunu h*ədislərdə keçən bütün tədavi yollarına aid edirmi? Bu suala onun sözlərində aydın bir cavab yoxdur.

Hər bir halda bu rəydə olan alimlərimizin sözləri üsul elmində əksəriyyət tərəfindən təsdiql*ənmiş m*ənaya müvafiqdir. O mənanı biz birinci müqəddimədə zikr etdik, yəni peyğəmbərimiz – salləllahu aleyhi va səlləm – düny*əvi işl*ərdə məsum deyildir, xəta edə bilər. Lakin bu xətalar sahibinin qafil olduğunu göstərəcək şəkildə, öz zamanının tibbi biliklərinə *müxalif olacaq* şəkildə çox ola bilməz. əl-Qadi İyad əl-Yəhsubi (hicri 544/miladi 1149) buyurur: "**Amma dünyəvi məsələlərdə onun əhvalına gəldikdə isə biz bunu düşüncə, söz və fel olaraq daha əvvəlki üslubda gətirəcəyik. Düşüncəyə gəldikdə o, şəriət məsələlərindən fərqli olaraq dünya işlərində bir şeyin bir cür olduğuna inana bilər və bunun əksi ortaya çıxa bilər və ya bu işlər barəsində şəkk və gümanda ola bilər... (Səhabələr) öz rəylərini bildirdiklərində o öz rəyindən döndü. Beləliklə də diyanət elmi, diyanət etiqadının və təliminin heç bir əlaqəsi olmadığı dünya işlərində bizim dediyimiz (yəni xəta) onun haqqında mümkündür, çünki bunların heç birində onun üçün bir nöqsan yoxdur; bu işlər sadəcə olaraq adətlə bağlı işlərdir ki, onları təcrübədən keçirənlər, onlarla maraqlananlar və onlarla məşğul olanlar bilirlər. Peyğəmbərin – salləllahu aleyhi va səlləm – qəlbi isə rübubiyyət mərifəti ilə doludur, köksü şəriət elmləri ilə doludur və ağlında ümmətinin dini və dünyəvi məsləhətləri əsas məqsəddir. Lakin bu, bəzi işlərdə olur, nadir hallarda və dünyadan yararlanmağı, onu kontrol etməyi məharətlə bacarmağı tələb edən işlərdə mümkündür. Yoxsa sahibinin xəstə və qafil olduğunu göstərəcək şəkildə çox işlərdə olması mümkün deyildir.**"[21]

**İkinci rəy**: Buradakı ikinci rəy əksər alimlərin rəyidir. Bu rəyə görə peyğəmbərin – salləllahu aleyhi va səlləm – sözlərində keçən təbabət və tədavi vəhy mənşəlidir, ona görə də xəta olması möhtəməl deyildir. Alləmə Bədruddin əz-Zərkəş*i bu m*əsələni

---

[20] "əl-Muvafəqat", 2/120-121; Dar İbn Affən, Qahirə, 1997;

[21] "əş-Şifə bi Tərif əl-Mustafa", 2/416-418; Darul-Fikr, Beyrut, 1988;

üsulul-fiqh kitabında qaldırır və deyir: "**Peyğəmbərin – aleyhissələm – təbabəti ümumilik ifadə edirmi? Bura qədər dediyimiz şəriət əhkamı haqqında idi, öz səhabələrinə, yaşadığı torpağın əhalisinə tətbiq etdiyi təbabətə gəldikdə isə əl-Hafiz Şəmsuddin əz-Zəhəbi "Muxtəsar əl-Mustədrak" kitabında deyir...**" və daha sonra əz-Zəhəbinin yuxarı təqdim etdiyimiz sözlərini gətirir və sonra deyir: "**Onun dediyi mübahisə götürən bir iddiadır, alimlərimizin, xüsusilə də "nəbəvi tibb" mövzusunda kitab yazmış alimlərimizin yazdıqlarının zahirindən (peyğəmbərin) digər əmrlər(i) kimi ümumilik anlaşılır. Ona görə də "qızdırmanı su ilə sərinləşdirin" hədisinin cavabında əziyyətə qatlanıblar, halbuki qızdırma növlərinin çoxunda tibb bunu icazəli görmür və bu hədisi qızdırma növlərindən buna uyğun gələnə aid ediblər. Onun (yəni əz-Zəhəbi'nin) təbabət mübah qismindəndir sözü doğru deyildir.**"[22] Bəli, xeyli sayda alim nəbəvi tibb haqqında ayrıca kitab yazıblar. Abdulməlik bin Həbib (h. 238/m. 853), *Əbul*-Qasim bin Həbib ən-Neysəburi (h. 245/m. 860), İbnus-Sunni (h. 363/m. 973), *Əbu Nueym* əl-*Əsb*əhəni (h. 430/m. 1038), *Əbul*-Abbas əl-Mustəğfiri (h. 432/m. 1041), əl-Xatib əl-Bağdadi (h. 463/m. 1072), *Əbu Abdill*əh əl-Humeydi (h. 488/m. 1090), Abdulxaliq əl-İşbili (h. 518/m. 1188), Ziyauddin əl-Mə*qdisi (h. 643/m. 1245),* Şəmsuddin *Əbu Abdill*əh əl-Bə'li (h. 709/m. 1309), Muhəmməd bin Yusuf əs-Sənusi (h. 890/m. 1490) və başqaları "ət-Tibb ən-Nəbəvi" adında kitablar yazıblar. Alləmə Bədruddin İbn Cəməah (h. 733/m. 1333) bu mövzuda yazdığı kitabına "Təzkira fit-Tibb ən-Nəbəvi" adını verib. *Əbul*-Həsən İbn Tarxan əl-Həməvi (h. 720/m. 1320) isə öz kitabına "əl-*Əhk*əm ən-Nəbəviyyə fis-Sinaatit-Tibbiyyə" adını verib. Dövrünün həkimlərindən sayılan Muvaffəquddin Abdullətif əl-Bağdadi (h. 629/m. 1231) tibb ilə bağlı qırx hədis toplamış və onları "əl-Ərbaun fit-Tibb ən-Nəbəvi" kitabında şərh edib. Mehdi bin *Əli* əs-Sabiri (h. 815/m. 1412), İbn *Əbi Bə*kr əl-*Əzraq (h. 890/m. 1485)*, Muhəmməd əs-Səxavi (h. 902/m. 1496), Cələluddin əs-*Suyuti (h. 911/m. 1505),* Şəmsuddin İbn Tulun (h. 953/m. 1546) və daha bir çox alim nəbəvi tibb haqqında müstəqil əsərlər yazıblar. İbnul-Qayyim'in bu gün "ət-Tibb ən-Nəbəvi" adı altında çap edilmiş kitabı müstəqil bir əsər deyildir, lakin onun "Zədul-Məad" kitabından ayrılaraq çap edilmiş bir kitabdır. İmam Şəmsuddin əz-Zəhəbi'yə aid edilən "ət-Tibb ən-Nəbəvi" adında kitab çap olunub və fərqli təhqiqlərlə nəşr edilib, amma bu kitabın əz-Zəhəbi'yə nisbəti bir çox tədqiqatçı tərəfindən sual altına qoyulub və yuxarıdakı nəqldə keçən sözlər də bunun əz-Zəhəbi'yə nisbətinin doğru olmadığını göstərir.

Bu kitabların yazılma məqsədi "nəbəvi tibbin" olduğunu göstərməkdir və bu tibbin *effektivliyini nümayiş etdirm*əkdir. Beləliklə də bu rəydə olan alimlərimizə görə "nəbəvi tibbin" mə*nşə*yi vəhydir. İbnul-Qayyim bu rəydəki baxış acısını belə ifadə edir: "**Onun – salləllahu aleyhi va səlləm – tibbi təbiblərin tibbi kimi deyildir; çünki peyğəmbərin – sallәllahu aleyhi va səlləm – tibbi yəqindir, qətidir və ilahidir. Vəhydən, peyğəmbərlik çırağından və əqlin kamilliyindən**

[22] "əl-Bəhr əl-Muhit fi Usulil-Fiqh", 4/261-262;

**qaynaqlanır. Başqalarının tibbi isə əksər hissəsi təxmin, güman və təcrübədir.**”[23] *Şeyx Əbu Muh*əmməd İbn *Əbi C*əmrə (h. 699/m. 1296) qara zirə toxumunun bütün xəstəliklərə dərman olması barəsində danışarkən deyir: "**Alimlər bu hədis barəsində danışıblar, onun ümumiliyini xüsusiləşdiriblər və bunu tibb və təcrübə əhlinin sözünə qaytarıblar. Bu cür deyənin sözündəki xəta aşkardır, çünki biz elmlərinin əsasını əksər hallarda güclü ehtimala dayanan təcrübə təşkil etdiyi halda həkimləri təsdiqləyiriksə o zaman öz nəfsindən danışmayanın sözünü təsdiq etmək onların sözünü təsdiq etməkdən daha doğrudur.**”[24] İbn *Əbi C*əmrə’nin də bu sözündən anlaşılır ki, hədislərdə gəlmiş tibbin qaynağı vəhydir, bəşər təcrübəsi ilə bir əlaqəsi yoxdur. Muhəmməd Abdulhəyy əl-Kəttəni (vəfatı hicri 1382/miladi 1962) “ət-Təratib əl-İdəriyyə” kitabında İbn Xaldun’un sözlərini tənqid edir və deyir: “**Alləmə Şeyx Abdulhədi əl-Əbyəri əl-Misri “Suud əl-Mətali” kitabında (2/155) onun bu sözlərinin ardınca necə də doğru deyib: “Bu xətaya heç nəzər salmağa dəyməz...**”[25] Abdulhədi əl-*Əbyə*ri miladi 1888-ci ildə v*əfat etmiş* əzharlı alimlərdəndir. Bu ikinci rəydə olan alimlərin sözlərini yazmaqla səhifələri doldurmaq istəmirik. Onsuz da bu qədəri ilə bu rəydə olan alimlərin baxış acısını anlamaq olur.

Öyr*ənmiş oluruq ki, tarix*ən alimlərimiz arasında bu mövzuda iki f*ərqli yanaşma olub.* Birinci rəydə olan alimlər də əl-Xattabi, əl-Məziri, əz-Zəhəbi, İbn Xaldun, əd-Dihləvi kimi çox böyük və görkəmli alimlərdir. Müasir tariximizdə əksər din alimləri ikinci rəyi mənimsəyiblər. Hətta bəziləri bu məsələni qətiyyətlə bilinən mövzulara daxil ediblər, fərqli rəylərə dözümsüz yanaşıblar. Muhəmməd *Əbu Ş*əhbə deyir: “**... iddia edirlər ki, peyğəmbər tibbi dünyəvi işlərdəndir ki, doğru da ola bilər, xəta da ola bilər. Bu iddia batildir...**”[26] Lakin bu cür q*əti bir yanaşma x*ətalıdır. Müasir alimlərdən bəziləri birinci rəyi daha doğru hesab edirlə*r. Şeyx* Muhəmməd Süleyman əl-*Əşqar bu bar*ədə danışan, bunu müzakirə edən və birinci rəyi doğru hesab edən alimlərdəndir.

---

[23] “Zədul-Məad fi Hədyi Xayril-İbəd”, 4/33;
[24] “Fəthul-Bəri”, 10/145;
[25] “ət-Təratib əl-İdəriyyə; Nizəm əl-Hukumə ən-Nəbəviyyə”, 2/231;
[26] “Difəun anis-Sunnə”, səh: 343

**RƏYLƏRİN MÜZAKİRƏSİ**: Bu rəyləri müasir tibb elmi işığında dəyərləndirməyimiz zəruridir. Əlbəttə ki, bu mövzu bir hissədən şəriətin əhatə dairəsinə daxil olur, ona görə də bəzi üsulul-fiqh kitablarında buna yer verilib. Amma işin əslində, mahiyyətində tibb elmi durursa bu mövzusunun müzakirəsində tibb elminə əsaslanmağımız labüddür. Tibb elminin dini yox, dünyəvi elmlərə daxil olduğunu iddia edən bir alim tanımıram. İbn Əbil-İzz əl-Hənəfi deyir: "**Elm peyğəmbərdən başqasından da ola bilər, lakin bu, tibb, hesab, kənd təsərrüfatı kimi dünyəvi elmlərdə mümkündür.**"[27] Yəni tibb elmi dünyəvi elmlərdən biridir. Müasir araşdırmacılardan bəziləri bunun əksini sübut etmək üçün İzzuddin bin Abdissələm'dən "**tibb şəriət kimidir; sağlamlıq məsləhətlərini cəlb etmək, xəstəliklərin fəsadını dəf etmək üçün icad edilib...**"[28] sözlərini nəql edir. Həqiqət budur ki, bu sözlərdə belə bir fikri dəstəkləmək üçün heç bir dəlil yoxdur, çünki alimin qəsdi hər iki elmin məqsədinin eyni olduğuna diqqət çəkməkdir. Bununla tibb elminin şəriət elmlərindən olduğunu qəsd etmir. Hətta İzzuddin bin Abdissələm bunu açıq şəkildə söyləmiş olsa belə bu, həqiqəti dəyişdirməz. Tibb elmi dünyəvi elmlərdəndir və təbiət elmlərinə daxildir.

O zaman belə bir sual üzərində düşünməyimiz lazımdır. Əgər üsul alimlərimiz peyğəmbərimizin – aleyhissələm – bəşəri elmlərdə xəta edə biləcəyini təsdiqləyirsə o zaman tibb elmi barədə dediklərinin hamısının vəhydən qaynaqlandığını necə iddia etmək olar? Hətta ayrı-ayrı hədislərin tərkibində bu mənaya dəlalət edəcək bir şeylər tapmaq mümkün olsa da bunu bütün tibbə şamil etmək üçün ümumi bir dəlil ilə qarşılaşmamışam. İkinci rəyin sahibləri bu ümumiləşdirmə üçün Əbu Said əl-Xudri'nin hədisini dəlil göstərirlər. Əbu Said deyir: "**Bir kişi peyğəmbərin – salləllahu aleyhi va səlləm – yanına gəldi və dedi: "Qardaşımın qarnı gedir." Dedi: "Ona bal içizdir." İçizdirdi və dedi: "Mən içizdirdim və qarnı daha çox getməyə başladı." (Peyğəmbər) dedi: "Allah doğru söyləyib, qardaşının qarnı isə yalan deyib.**"[29] Bu rəy sahiblərinə görə peyğəmbərimiz – aleyhissələm – bal ilə tədavini Allaha nisbət edir, ona görə də peyğəmbərin tibbi mütləq vəhydən qaynaqlanmalıdır. Bu hədisi bu mənada dəlil göstərmək bəzi alimlərimiz tərəfindən tənqid olunub. Onlara görə hətta bu məqamda peyğəmbərin – aleyhissalətu vassələm – təklif etdiyi tədavi vasitəsi Allahdan olsa da bütün digər halları bunu aid etmək üçün kifayət etmir. Çünki birinci rəyin sahibləri peyğəmbərin hədislərindəki təbabətin bir hissəsinin vəhydən qaynaqlana biləcəyini inkar etmirlər.

---

[27] "Şərh ət-Tahaviyyə", 1/230;
[28] "Qavaidul-Əhkəm fi Məsalih əl-Ənəm", 1/6;
[29] "Sahih əl-Buxari", (5716)

İkinci rəy sahiblərinin sözlərində diqqətimizi çək*ən bir başqa xüsusiyyə*t budur ki, onlar təcrübə ilə əldə *edilmiş tibbi bilikl*ərin qəti olmadığını deyirlər. Ona görə də bu cür biliklər ilə hədislər arasında ziddiyyət gördüklərində ona əsaslanaraq hədislərin mənasını təvil etməyi doğru hesab etmirlər. Bu iddia qismən doğrudur, yəni tibb elmlərinin bir hissəsi ehtimal üzərində durur, lakin bu, bütün tibb elminə aid deyildir. *Keçmişin t*əcrübələri statistik xarakter daşıyırdısa bu gün laboratoriya təcrübələri əksər hallarda dəqiq nəticələr hasil edir. Mikroorqanizmlərin necə xəstəliyə səbəb olduğunu və buna qarşı necə mübarizə aparmağı öyrədən tibb elmlərinin çoxu dəqiqdir. İbn *Əbi* Cəmrə və İbnul-Qayyim kimi alimlərin sözlərini onların öz dövrlərindəki tibb elmləri işığında qəbul etməliyik. O sözləri bizim günümüzdəki tibb elminə tətbiq etmək böyük bir xəta olardı.

Bu gün müasir elmi nəticələrin işığında bəzi fikirləri daha dəqiq dəyərləndirə bilirik. Hər hansı bir alim peyğəmbərin – aleyhissalətu vassələm - sözünü təzim etmək üçün onu ən gözəl mənada izah etməyə çalışsa da bu izahlar heç də hər zaman müsbət bir nəticəyə gətirib çıxarmır. Misal üçün Alləmə İbnul-Qayyim'in nəbəvi tibb haqqında bu dəyərləndirməsinə nəzər salaq. "**Çox sayda xəstənin nəbəvi tibb ilə sağalmadığını inkar etmək olmaz, çünki ondan faydalananlar onu qəbul edən, onun şəfa olduğuna etiqad edən kəslərdir. Kamil şəkildə qəbul etmək isə iman və tabeçilik ilə olur. Qəlblərdəki xəstəliyin şəfası olan bu Quran tam şəkildə qəbul olunmazsa qəlbdəki xəstəliklərə ondan şəfa hasil olmaz, əksinə münafiqlərin xəstəliklərini daha da artırar. Bədənlərin tibbi bu məqama çata bilməz, ona görə də Quranın şəfası pak ruhlara və diri qəlblərə münasib olduğu kimi nəbəvi tibb də yalnız pak bədənlərə münasibdir. İnsanların nəbəvi tibbdən üz çevirmələri onların Quranın şəfasından üz çevirmələri kimidir. Bu, dərmanın özündəki qüsura görə deyildir, lakin (xəstənin) təbiətinin natəmiz, yerin fasid olmasına görədir və dərmanı qəbul etməməsinə görədir.**"[30] Bu sözün xülasəsi budur ki, nəbəvi tibb yalnız onun şəfa olduğuna inananlara fayda verir, onun şəfa olduğuna inanmayanlara isə fayda verməz. İbn Həcər əl-Asqaləni də bunun eynisini deyir: "**Sünnətdə varid olan hər bir şeyi sidq ilə istifadə etdikdə ondan istifadə edənə faydası olur və Allah onun niyyətinə görə ondan zərəri dəf edir. Əksi olduqda isə nəticə əksinə olur.**"[31] Alimlərin sözündə nəbəvi tibbin faydasını iman və etiqad ilə məhdudlaşdırmaq ola bilsin ki, o dövr üçün pak və gözəl görünsə də bizim bu zamanımızda tamamilə qəbul edilməz bir izaha çevrilib. Çünki bu deyilənlər doğru olsaydı nəbəvi tibbin həqiqi tibb olmadığını, sadəcə psixoloji təsirdən ibarət olduğunu söyləməliyik. Buna elmi dildə plasebo (placebo) effekti deyirlər. Bir dərman hətta saxta olsa belə *onun* şəfa verəcəyinə inandıqda imanın gücü ilə bədənin xəstəliyə müqaviməti artır. Bu effekti bəziləri dopamin maddəsinin bədəndə çoxalması ilə əlaqələndirirlər. Əgər biz hədislərdə gələn təbabətin və tədavinin İbnul-Qayyim kimi

[30] "Zədul-Məad", 4/33;
[31] "Fəthul-Bəri", 10/165;

tamamilə vəhydən qaynaqlandığını qəbul etsək və ondan sonra bu tədavinin təsirini İbnul-Qayyimin izah etdiyi kimi imanın gücü ilə əlaqələndirsək çox qəribə bir nəticə ortaya çıxacaq. Belə çıxacaq ki, vəhyin insanlara öyrətdiyi tibb sadəcə psixoloji təsirdən başqa bir şey deyildir, sadəcə imanın gücü ilə çalışan plasebo dərmanıdır. Bu iki rəyi bir arada birləşdirmək doğru deyildir. Əgər bu hədislərdəki təbabətin vəhydən götürüldüyünü desək o zaman o dərmanların həqiqi kliniki fiziki effektlərinin olduğunu deməliyik, inananlara təsir etdiyi kimi inanmayanlara da təsir edəcəyini söyləməliyik. Çünki həqiqi dərmanın təsiri xəstənin inancından asılı deyildir, Allahın onda yerləşdirdiyi tibbi qüvvədən asılıdır. Belə bir izahın ikinci problemli tərəfi budur ki, əgər peyğəmbər bal qəbul etməyi məsləhət görübsə, xəstə isə iman etdiyi üçün onun xeyrini görübsə o zaman burada sağaldan faktor bal yox, imandır. Bu halda o tədavi metodunu xüsusiləşdirməyin mənası yoxdur, o balı süd ilə əvəz etmək bir şey dəyişdirməməlidir. Əslində İbnul-Qayyim'in, İbn Həcərin verdiyi izahat İbn Xaldunun dediyini rədd eləmir, çünki İbn Xaldun da eyni şeyi deyir. Aradakı fərq budur ki, İbn Xalduna görə peyğəmbərin tədavi metodu xalq təbabətindən götürülüb, amma bu tibbin səhabələrə fayda verməsi onun vəhydən qaynaqlanmasına görə olmayıb, səhabələrdəki imanın gücü ilə olub. İbn Xaldun'dan yuxarıda nəql etdiyimiz sözlərin sonunda o, deyir: "**Ola bilsin ki, təbərrük və iman etiqadındakı sidq yolu ilə işlədilməsi istisnadır, bu zaman çox böyük faydası ola bilər. Bu, orqanizm tibbi ilə bağlı deyildir, bu sadəcə olaraq iman kəliməsinin təsirindəndir, necəki bu, qarın xəstəsinin bal ilə tədavi edilməsində baş vermişdi.**"[32] Şübhəsiz ki, İbn Xaldunun izahı yuxarıdakı ziddiyyətə düşmür, əksinə tamamilə tutarlı bir izahdır. Bu tibbi vəhydən görüb onu plasebo təsiri ilə izah etmək isə açıq bir ziddiyyətdir.

[32] "Tərix İbn Xaldun", 1/651

**HƏDİSLƏRİ ANLAMAQ**: Bütün bu yazdıqlarımızın işığında təbabət hədislərini anlamağımız üçün alimlərimizin sözlərində bəzi alternativlərin olduğunu qeyd etməliyik. Bu alternativlər bizə peyğəmbərin tibb ilə bağlı sünnətini ən doğru şəkildə anlamağımıza kömək edir. Bəzən bir hədisi birdən çox alternativ ilə *başa düşmə*k mümkündür, lakin bu mövzudakı hədislərin hamısına eyni şəkildə yanaşmaq doğru deyildir. Biz bu alternativləri aşağıdakı tərtib ilə sıralayırıq.

- Müasir tibbi imkanlar işığında hədisdəki təbabətin və tədavinin doğru olduğu sübut olunarsa hədis zahirinə görə götürülür və təvil edilmir, olduğu kimi qəbul olunur.
- Müasir imkanlara görə hədisdə keçən tədavi doğru olmasa da peyğəmbərin – aleyhissələm - əsrindəki imkanlara görə doğru olması mümkündür. Bəzi tədavi metodları köhn*əlmiş ola b*ilər, misal üçün bu gün müalicə etmək mümkün olduğu halda heç kim çürümək riski qarşısında qalmış bir əzanı kəsmir, lakin müalicə imkanı olmayan bir zaman üçün ən doğru tibbi tədbir əzanı kəsmək olacaq. *Əgə*r hədislərdə keçən tədavini bu m*ənada başa düşmə*k mümkündürsə elə də etmək lazımdır. Bu halda da hədisi təvil etməyə ehtiyac yoxdur, zahirinə görə qəbul edilməlidir.
- Ola bilər ki, peyğəmbərimiz – aleyhissalətu vassələm – müəyyən bir halda müəyy*ən bir ş*əxsi hansısa vasit*əyə irşad edib və* həmin adam vasitəsinin səbəbi ilə yox, peyğəmbərin duası və bərəkəti ilə sağalıb. Bu kimi hallar təbabət və tədavi halları sayılmamalıdır və hər kəs üçün keçərli olan ümumi bir hal kimi götürülməməlidir.
- İlk iki alternativin heç biri mümkün deyilsə, dəqiq tibbi elmlər ilə uyğunsuzluq varsa, lakin hədisi *başqa* mənalar*da başa düşmə*k mümkündürsə o zaman o mənalara təvil etmək vacibdir. Peyğəmbər kəlamında bu şəkildə məcazi m*ənada deyilmiş h*əqiqətlər az deyildir.
- Hədis *əgər onu başqa* mənaya təvil etməyə imkan verməyən ləfzlərlə varid olubsa və ilk iki alternativlə izah etmək də mümkün deyilsə, o zaman qarşımızda iki yol vardır. Birinci rəydəki alimlərin rəyini götürsək o zaman peyğəmbərin – aleyhissalətu vassələm – burada xəta etdiyini deyə bilərik. İkinci rəydəki alimlərin rəyini götürsək onda hədisin səhih olmadığını deməliyik.
- Əgər hədisdə keçən tədavi metodu və ya tibbi iddia müasir tibbi imkanlar tərəfindən nə təsdiqlənərsə, nə də inkar olunarsa o zaman hədis zahiri üzərində qalmalıdır, onu təvil etməyə ehtiyac yoxdur. Çünki ola bilsin ki, hədisdəki tibbi sirri gələcək nəsillər tapacaqlar. Bu, əksər alimlərimizin məzhəbinə görədir. Birinci rəyin sahiblərinə görə burada hər hansı bir sirr axtarmağa ehtiyac yoxdur, bunu sadəcə olaraq peyğəmbərimizin –

aleyhissalətu vassələm – öz dövründəki xalq təbabətindən istifadə*si kimi başa düşmə*yimiz lazımdır.

Burada önəmli bir məqama toxunmağımız lazımdır. Hədislərdəki təbabətin doğru olmadığını, xəta olduğunu söyləməyimiz üçün sadəcə bəzi həkimlərin sözlərindən çıxış etməyimiz düzgün deyildir. Hədisin zahirindən anlaşılan tədavinin xətalı olduğunu yalnız qəti elmi sübutlar əsasında söyləmək mümkündür. Bizim bu dediyimiz əlbəttə ki, islam alimlərinin sözləridir. əl-Məziri "əl-Mulim" kitabında deyir: "**Biz peyğəmbərin – salləllahu aleyhi va səlləm – sözünə həkimlərin təsdiq etməsi ilə sahib çıxmırıq, əgər onlar peyğəmbəri təkzib etsələr biz onları təkzib edərik, onları təkfir edərik, onu isə - salləllahu aleyhi va səlləm – təsdiq edərik. Həkimlər öz dediklərinin doğru olduğunu müşahidə ilə bizə göstərsələr o zaman biz onun – salləllahu aleyhi va səlləm – sözünü təvil etməyə, onu doğru mənada yozmağa ehtiyac duyacağıq, çünki qəti dəlillər onun yalan danışmadığını isbat edib.**"[33] Bu sözləri ilə əl-Məziri bizim üçün bir düstur hazırlayıb. Sanki hər hansı bir hədisin zahirinin tibb baxımından doğru olmadığının *müşahidə*lər yolu ilə isbat oluna biləcəyini nəzərə alıb. Ona görə də bu sözlərinin həmən ardından deyir: "**Həkimlər öz sözlərini müşahidə ilə dəstəkləsələr ehtiyac yaranar deyə... biz bu və bundan sonrakı cavabı hazırlıq kimi yazdıq.**" Allah alimlərimizə rəhmət etsin, həqiqətən də bizə böyük bir sərvət tərk ediblər. əl-Məziri'nin bu sözlərini Ə*bul*-Abbas əl-Qurtubi "əl-Mufhim" kitabında, Əbu Abdilləh əl-Qurtubi təfsirində, İbnul-Muləqqin "ət-Təvdih" kitabında qeyd edirlər və təsdiqləyirlər.

[33] "əl-Mulim bi Fəvaid Muslim", 3/170;

**ÖNƏMLİ QEYD**: Biz Muhəmmədin – salləllahu aleyhi va səlləm – peyğəmbər olduğunu, onun doğru sözlü olduğunu bu cür hədislərə əsasən təsdiq etmirik. Biz onun Allahın elçisi olduğuna gətirdiyi risaləyə görə inanırıq. Bunun dəlilləri və müzakirəsi üsulud-din elmində təfsilatı ilə ələ alınıb.

Ona görə də müsəlmanların düşünmədə*n düşdüklə*ri və başqalarını düşürdükləri təhlükəli bir vəziyyətə diqqət çəkmək istəyirəm. Hər hansı bir hədisi götürüb "möcüzə" kimi reklam etmək, onu peyğəmbərliyin sübutu kimi afişaya çıxarmaq inanılmaz dərəcədə səthi bir addımdır. Sabah o möcüzənin əsasını t*əşkil edə*n elmi tədqiqatların xətalı olduğu üzə çıxarsa illərlə möcüzə olduğu deyilən hədisin adi bir izahı olduğu aşkarlanarsa savadsız müsəlmanların düşdükləri hal onların imanı üçün təhlükəli olacaq; çox təəssüf ki, bu hallarda savadsızlar hədisi doğru mənada yozmayan insanları ittiham etmir, bir başa hədisin özünü və ya hətta peyğəmbərin özünü ittiham edir. Beləliklə də imandan çıxıb küfrə girir. *Əg*ər biz insanları İslam dininə, o dini Allahın göndərdiyinə inandırmaq istəyiriksə bu cür üslublardan istifadə etməməliyik. Bunun üçün onsuz da kifayət qədər əqli və nəzəri dəlillər mövcuddur.

*Bu cür xoşa g*əlməz hallarla dəfələrlə qarşılaşmışıq. Bu, bəsirət sahiblərinin imanını təmin etməz, bu yalnız dəb üzərində din quranların imanını təmin edər, belə insanların etiqadı fəsillərə görə, dəblərə görə d*əyişir. Əsl mömin isə* Allahı və nübuvvəti bəsirət gözü ilə görməli və doğru dəlillərə əsasən bunu təbliğ etməlidir.

